# Ubanq dili

Vikipediya, azad ensiklopediya

**Ubanq dili** — Niger-Konqo dilləri ailəsinin Bendi dilləri qrupuna daxil olan dil. Təxminən 11 min nəfər bu dildə danışır[1].

Ubanq dili öz unikal xüsusiyyətinə görə dünyanın digər dillərindən fərqlənir. Belə ki, Nigeriyada eyniadlı kənddə yaşayan bu dilin daşıyıcısı olan ubanqlı kişilər və qadınlar ayrı formada danışırlar. Düzdü, oğlan uşaqları 10 yaşına kimi qadınların danışdığı dildə danışa bilər. Buna kimsə etiraz etməyəcək; ancaq oğlan uşağının 10 yaşından sonra da qadın dilində danışmağı məqsədəuyğun deyil. Əgər bir oğlan, "kişi" dilində danışırsa deməli bu uşaq artıq yeniyetmədir. Uşaq müvafiq yaşda doğru dilə keçmirsə, hesab olunur ki, deməli onda nəsə bir "anormallıq" var.

Ubanqlılar bu fərqliliklə qürur duyur və bunu Tanrının bir hədiyyəsi sayırlar. Onlar deyir ki, *“Tanrı Adəm, Həvva və Ubanq xalqını yaradıb"*.

2016-cı ildə Nigeriya Linqvistik Assosiasiyası ölkədəki 500 dildən 50-nin yaxın illərdə yox olacağını açıqlayıb. Bunların içərisində Ubanq dilidə yer alır. Ubanqlılar gələcəkdə Ubanq dili mərkəzinin qurulmasını arzu edirlər. Çünki onlar fikirləşirlər ki, dilləri öləcəksə, Ubanq xalqı da artıq yox olacaq.

## Mənbə


- Ubang: The Nigerian village where men and women speak different languages (https://www.bbc.co.uk/news/world-africa-45262081). bbc.co.uk, 23.08.18 (azərb.)


## İstinadlar


1. Ubang (https://www.ethnologue.com/18/language/uba/) at Ethnologue (18th ed., 2015)


## Xarici keçidlər

- Nigeriyanın Ubanq kəndində qadınlar və kişilər ayrı ayrı dillərdə danışırlar (https://www.youtube.com/watch?v=c6vtDNVKDtk) — YouTube (azərb.)